# HƏNƏFİ MƏZHƏBİNƏ GÖRƏ HƏYAT YOLDAŞININ GÖZƏL, BAŞIN BÖYÜK, CİNSİYYƏT ÜZVÜNÜN KİÇİK OLMASI NAMAZDA İMAM DURMAQ ÜÇÜN SƏBƏBDİRMİ?

***Rüstəm Mehdi***
*22 rəcəb, 1442.*
*06 mart, 2021.*

Kainatın rəbbinə həmd-səna, onun ən şərəfli elçisi Məhəmmədə, ailəsinə, əshabələrinə və onların yolu ilə gedənlərə Allahın salamı, rəhməti və bərəkəti olsun.

Bir neçə il əvvəl bə’zi rafizilərin ərəb rafizi forumlarından götürüb əllərində bayraq etdiyi bu məsələ haqda bir yazı yayınlamışdım. Bunun üzərindən bir neçə il ötdükdən sonra, şübhə tonqalı ətrafında əl-ələ tutub dövrə vuranlara yeni insanlar da qatıldı. Bu səfər səhnədə yeni artistlər var idi; elmlə gündəmdə qala bilməyəcəklərini başa düşdükləri üçün nəyin bahasına olursa olsun adlarını unutdurmamağa çalışan cəhalət timsalı bə’zi vahabilər.

Bu səbəbdən əvvəllər haqqında danışdığım bu mövzuyla əlaqəli yenidən məqalə yazmağı labüd gördüm. Təbii ki, məqalənin hədəfi şübhə əhlini nəyəsə qane etmək deyil, çünki dəfələrlə hər iki firqənin içindən yalanı adət etmiş şəxslərin ifşa edilməsinə baxmayaraq onlar üçün heç bir fərqi olmayıb. Nə bir utanma, nə bir tövbə, nə də şəxsiyyət yetkinliyinə doğru bir inkişaf... Bu səbəbdən mən bu cür insanları, «iflahından ümid kəsilmiş insanlar» olaraq görürəm və onların nəyisə başa düşəcəyinə inanmıram.

Məqaləni bu mövzuda qalıcı bir izaha ehtiyac hiss etdiyim üçün yazıram. Mövzu şübhə əhlinin saqqıza çevirməsi üçün münasibdir və şeytan insanları bu cür şübhələrlə tez məşğul edir. Bu səbəbdən elm əhlindən biri olaraq gördüyüm boşluqları doldurmaq istəyirəm... bunun üçün yazıram.

Məqaləni iki başlıq halında təqdim edirəm:

1) Bu mövzuda nəql edilən şeylərin mə’nası nədir? Doğrudanmı bu sözü deyən alimlər, boşboğazların iddia etdiyi mə’naları qəsd etmişlər?

2) Bu şeylər hənəfi məzhəbinə aid bir görüş hesab edilə bilərmi? Allahın izni ilə bu başlıq altında bu şeylərin məzhəbin mö’təbər kitablarında keçmədiyindən, ümumiyyətlə fiqh kitablarında keçən hər şeyin fiqhi bir görüş olmadığından danışacağam.

Müvəffəqiyyət Allahdandır.

## BU QEYD EDİLƏN ŞEYLƏRİN MƏ'NASI NƏDİR?

Əvvəlcədən qeyd edim ki, kimin deməsindən və hansı mə'nanı qəsd etməsindən asılı olmayaraq, hər üç şəkildə ölçü qoymaq yanlışdır, batildir. Lakin qeyd edilən hər üç ölçüdə boşboğazların iddia etdiyi mə'nalar qəsd edilmir.

Əslində bunu başa düşmək üçün bu sözlərin şərhinə baxmağa da ehtiyac yox idi. Ağlı başında hər kəs görər ki, imamlığa daha layiq olmaq üçün qeyd edilən ölçülərin əvvəlində elm və təqva xüsusiyyətləri qeyd edilir. Bir neçə insan bu iki xüsusiyyət kimi üstünlüyə dəlalət edən digər vəsflərdə eyni səviyyədə olarsa, bundan sonra onlar arasından birini seçmək üçün əlavə təkliflər qeyd edilir. Boşboğazların əllərində bayraq etdikləri bu vəsfləri də bə'zi alimlər həmin bu ikinci dərəcəli təkliflər arasında qeyd etmişdir. Təkcə bunu başa düşmək məsələni anlamaq üçün kifayət idi; birinci dərəcəli ölçü kimi təqvanı və elmi qeyd edən bir alimin, kiminsə övrətinə və yaxud xanımının gözəlliyinə baxmaq kimi təqvaya tərs, haram bir əmələ çağırması necə mümkün ola bilərdi?

İmamlıqda bu kimi ikinci dərəcəli ölçülərdən danışan fəqihlərə görə bə'zi hallar var ki, o hallar insanın daha təqvalı, yaxud daha ağıllı olmasına işarə edirdi. Təbii ki, həmin fəqihlər bu məsələdə yanılmış və bu şeyləri öz dövrlərində yayğın olan düşüncəyə əsasən demişdilər.

Necə ki, bu gün yayğın olan səhv bir düşüncəyə görə universitet diplomuna sahib olmaq insanın elmli olmasını göstərir, eləcə də o dönəmdə yayğın olan yanlış düşüncəyə görə bə'zi hallar insanın təqvasına, yaxud ağlına dəlalət edirdi.



### Daha yaxşı xanım.

Məzhəbə ləkə yaxmağa çalışan vahabilər və rafizilər həmişə olduğu kimi «nə əldə etdik qənimətdir» deyərək yalana baş vurmaqdan çəkinmirlər. Qaynaq göstərdikləri «Məraqil-fəlah» kitabında bu yalançıların iddia etdiyi kimi «arvadı daha gözəl olan» sözü keçmir. Doğru tərcümə «xanımı daha yaxşı olan» şəklindədir. Çünki kitabda «əl-əcməlu zövcətən» (xanımı daha gözəl olan) deyil, «əl-əhsənu zövcətən» (xanımı daha yaxşı olan) sözü keçir. Bu ikisi arasında isə fərq çox böyükdür. Birinci ifadə ərəb dilində zahiri görkəmə aid olduğu halda, ikinci ifadə həm də mə'nəvi üstünlüklərə dəlalət edir.

Burada qəsd olunan mə'na budur ki, kimin xanımı ona qarşı gözəl davranış sərgiləyərsə, bu şey adətən onun öz xanımına qarşı daha çox bağlanmasına səbəb olar. Xanımına daha çox bağlanan bir şəxsin isə başqa bir qadınla zina etmə ehtimalı zəif, iffətli qalma ehtimalı isə güclüdür. İffət də təqvaya səbəb olduğu üçün bu cür birinin imam durması daha yaxşıdır. Bu Haqda İbn Abidin belə deyir: ««Xanımı daha yaxşı olan» sözü ilə qəsd olunan budur: bu cür bir xanımı olan kişi ona daha çox bağlandığı üçün başqa qadınlara meyl etməz. Bu da onun daha iffətli ol-

masına yol açar». [İbn Abidin, «Raddul-muhtar aləd-durril-muxtar», III, 522]

Əslində məqsədin və ölçünün iffət olduğunu «Məraqil-fəlah» kitabının müəllifi də qeyd edir: «Sonra isə (bu sadalanan vəsflərdə bərabər olan bir neçə şəxs arasında) xanımı daha yaxşı olan birinin imam durması məqsədəuyğundur, çünki belə birisi (adətən) daha çox iffətli olur». [əş-Şurunbuləli, «Məraqil-Fəlah bi imdədil-Fəttah», 348]

Kitaba haşiyə (izah) yazmış Şeyx Əhməd ət-Tahtavinin sözlərini isə qeyd etməmək olmaz: ««Xanımı daha yaxşı olan» ifadəsinə gəlincə, ona (ərinə) görə daha yaxşı olması qəsd edilir. Bu isə ərinin onu daha çox sevməsiylə əlaqəlidir. Müəllifin burada «əl-əhsən/daha yaxşı» sözünü istifadə etməsi də onu göstərir ki, məqsəd ərinin onu daha çox sevməsidir. Çünki bu hal adətən kişi ilə qadın arasındakı bağlılığı artırır... Bu səbəbdən «xanımı daha yaxşı olan» ifadəsi yerinə «xanımını daha çox sevən» deyilməsi daha çox məqsədəuyğun olardı.» [ət-Tahtavi, «Həşiyətut-tahtavi alə məraqil-fəlah», 301]

Həm İmam əş-Şurunbuləlinin, həm də Əhməd ət-Tahtavinin sözlərindən açıq şəkildə gördüyünüz kimi, burada qəsd edilən qadının zahiri gözəlliyi deyil, ərinə qarşı xoş münasibətidir ki, bu da onlara görə kişinin daha iffətli olmasına səbəb olurdu. Bu səbəbdən ət-Tahtavi, məqsədin daha yaxşı başa düşülməsi üçün «xanımını daha çox sevən» ifadəsinə üstünlük verir. Yə'ni məqsəd kişinin iffətinə yol açacaq sevgi və o sevgiyə səbəb olacaq gözəl rəftar, xoş xasiyyətdir.[1] Odur ki, bə'zi zəvzəklərin «qadınların gözəlliyini ölçmək lazımdır?» - kimi axmaq bir sual verərək sırtıqlaşmasına əhəmiyyət verməmək lazımdır, çünki kitabda belə bir şey keçmir, məqsəd tamamilə başqadır.

Üstəlik ət-Tahtavinin «ona (ərinə) görə daha yaxşı olması qəsd edilir» sözü də bunu açıqlayır; əgər burada məqsəd qadının zahiri gözəlliyi olsaydı bunun təkcə ərinə görə olması şərt qoşulmazdı. Çünki zahirən gözəl olan biri hər kəsə görə gözəl olur. Bu səbəbdən «ərinə görə» ifadəsi bir daha qadının xoş rəftarından söhbət getdiyini göstərir, çünki ərinin sevgisini qazanması məhz ona qarşı xoş rəftarından asılıdır.

Bəs görəsən bu şeyi insanlar necə tə'yin edə bilər? Axı bir başqasının xanımının ona nə qədər xeyirxah olduğunu yalnız o ailəyə yaxın olanlar bilə bilər. Camaat namazında iştirak edən onlarla insan bunu necə bilsin?

Cavab: Bu qeyd edilən şeylər camaat namazında iştirak edən hər kəs üçün deyil, sadəcə bu şeylərdən xəbərdar olan qohumlar və yaxınlar üçün keçərlidir. İbn Abidin də az əvvəl qeyd etdiyim izahından sonra bu nöqtəyə toxunaraq belə deyir: «Bu (xanımın öz ərinə qarşı nə qədər xoş rəftarlı olması) qohumlar və qonşular arasında bilinən bir şeydir. Burada namaz qı-



[1] Boşboğazlar bu sözün həm «Məraqil-fəlah» həm də ət-Tahtavinin haşiyəsində keçdiyini iddia edirlər. Bu da onu göstərir ki, qaynaqları kitablar yox, sapla samanı ayırmadan yazılar yayan bə'zi xarici forumlarıdır. Çünki ət-Tahtavinin haşiyəsində əlavə bir qeyd olaraq belə bir şey keçmir, o, sadəcə olaraq «Məraqil-fəlah»da keçən sözü izah edir.

lanların, kimin daha layiq olduğunu tə'yin etmək üçün bir-birilərinə öz xanımlarından bəhs etməsi qəsd edilmir». [İbn Abidin, «Raddul-muhtar aləddurril-muxtar», III, 522]

İbn Abidinin bu sözündə başqa vacib bir məqam da var. O, bu məsələnin qohumlar və qonşular arasında bilinəcəyini deyir. Mə'lum məsələdir ki, qədimdə qadınların üzləri örtülü olduğu üçün qonum-qonşu, hətta qohumlardan bir çoxu onların üzünü görə bilmirdi. Yə'ni o dövrdə qadının üzünün gözəl olub olmaması hətta qohum və qonşu kişilər arasında belə bilinmirdi. Bu gün belə, xanımı niqablı olan şəxslərlə dostluq edənlər, uzun müddət keçsə də o xanımların üzünü tanımırlar. Belə olduğu halda qadınların zahiri gözəlliyindən necə söhbət gedə bilər? Axı naməhrəm kişilər arasında bilinməyən bir şey onlar arasından namaz imamı tə'yin etmək üçün ölçü ola bilməz.

Lakin xanımların itaətkarlığı qohumlar və dostlar arasında nadirən də olsa bilinə bilər. Bu da alimlərdən nəql etdiyimiz izahı dəstəkləyir və məqsədin zahiri gözəllik deyil, kişinin sevgisini artıran, başqa qadınlara meyl etməsini əngəlləyərək onun iffətini qoruyan xoş rəftar, gözəl davranış olduğunu göstərir.

Az əvvəl İbn Abidindən nəql edilən qismdə də gördüyünüz kimi, bu məsələ qohumlar, yaxınlar arasında bilinərsə əməl edilə bilər, lakin bilinməzsə bunun müzakirəsi açılmaz.

Bir sözlə, burada qəsd edilən mücərrəd sevgi deyil, o sevginin yol açacağı hallardır. Bu hallardan biri də az əvvəl qeyd edildiyi kimi şəxsin iffətli olmasıdır.



Sevginin yol açacağı başqa bir xüsusiyyət də[2] kişinin öz xanımına qarşı münasibətini gözəlləşdirməsidir. Mə'lum məsələdir ki, xanımını daha çox sevən biri ona qarşı daha xeyirxah münasibət bəsləyir. Peyğəmbərimiz (ona Allahın salamı olsun) bir hədisində: «*Ən xeyirliniz, xanımına qarşı ən xeyirxah olanınızdır*» - buyurduğuna görə, xanımına qarşı daha xeyirxah davranan, digər insanlardan daha xeyirli olur. Bu da onun namazda imam durmağa daha layiq olduğunu göstərir. Çünki peyğəmbərimiz (ona Allahın salamı olsun) başqa bir hədisdə: «*İmamlarınızı ən xeyirlilərinizdən seçin*» - buyurur. Bə'zi fəqihlər də məhz buna işarə etmişlər; xanımı xoş xasiyyətli olan biri onu daha çox sevər, onu daha çox sevən biri ona qarşı daha xeyirxah davranar, xanımına qarşı daha xeyirxah davranan biri insanların ən xeyirlisi olar, insanların ən xeyirlisi isə namazda imam durmağa daha layiqdir.

**Başın böyüklüyü.**

Başın böyüklüyünün də özü deyil, o dövrün insanlarına görə dəlalət etdiyi mə'na qəsd edilir. Qədimdə yayğın olan yanlış düşüncəyə əsasən insanlar, başın eybəcər şəkildə kiçik olmasını sahibindəki təbiət zaylığına əlamət kimi görürdülər. Misal üçün İbn əl-Cövzi «Əxbarul-həmqa

---

[2] Bu ikinci izahı Şeyx Bilal Feysal əl-Bəhrin yazısında görmüşəm.

vəl-muğaffəlin» kitabında belə deyir: «Filosoflara görə baş eybəcər və kiçik olarsa, bu beyinin də eybəcər olduğuna dəlildir. Qalen: «(Həddən artıq) kiçik olan hər baş, beyinin anormal şəkildə olmasına işarədir» - demişdir».[3] [İbn əl-Cövzi, «Əxbərul-həmqa vəl-muğaffəlin», 30]

Bu səbəbdən başın böyüklüyündən danışan fəqihlər bu məsələni dini bir məsələ olaraq ələ almamışlar. Onlar elə zənn etmişlər ki, başın kiçikliyi insanın təbiətinə və ağlına mənfi tə'sir edirsə, başın digər üzvlərlə ahəngi pozmayacaq səviyyədə böyük olması da insan təbiətinə və ağlına müsbət tə'sir edə bilər. Bu haqda İbn Abidin belə deyir: «Başın böyüklüyü, ağıllı olmağa dəlalət etdiyi üçün qeyd edildi. Təbii ki, burada digər üzvlərlə ahəngin pozulmayacağı böyüklükdə olması qəsd edilir. Əgər baş həddən çox böyük və digər üzvlər həddən çox kiçik olarsa bu həmin şəxsin təbiətindəki pozuntuya işarədir. Bu isə ağlının mö'tədil olmamasına (yə'ni nisbətən azlığına) dəlalət edər.» [İbn Abidin, «Raddul-muhtar aləd-durril-muxtar», III, 523]

**Üzvün kiçikliyi**

Boşboğazların qaynaq olaraq göstərdiyi kitabların heç birində «cinsi orqan» sözü keçmir. Nə «Məraqil-fəlah», nə də «əd-Durrul-muxtar» kitabında belə bir söz var. Bu kitabların hər ikisində, «əl-əsğaru udvən», yə'ni «üzvü kiçik olan» sözü keçir. [Bax: əş-Şurunbuləli, «Məraqil-fəlah bi imdədil-Fəttah», 348; əl-Haskəfi, «əd-Durrul-muxtar şərh tənviril-əbsar», 76]

Sadəcə olaraq ət-Tahtavi bə'zi şeyxlərin bu sözə kişinin cinsi orqanı kimi izah verdiklərini deyir, lakin onların kim olduğunu bildirmir. Bu səbəbdən bu izah sahiblərinin məchul olduğunu deyə bilərik.

Bunun əksinə, məzhəbin alimlərindən Əbus-Suud «üzv» sözünü kişinin cinsi orqanına yozmağı qınayaraq qəti şəkildə rədd edir: ««Üzv» sözüylə nə qəsd edildiyinə baxılmaıdır. Burada bə'zilərindən elə şeylər nəql edilmişdir ki, onu nəinki yazmaq, dilə gətirmək belə olmaz.» [Əbus-Suud, «Fəthul-muin alə molla miskin», I, 207] İbn Abidin də onun bu sözünü qeyd edərək heç bir e'tiraz irəli sürmür və belə deyir: «Sanki bununla o, (Əbus-Suud) «üzvdən məqsəd kişinin cinsi orqanıdır» deyənləri qəsd edir». [İbn Abidin, «Raddul-muhtar aləd-durril-muxtar», III, 523]

Gördüyünüz kimi, bə'zi boşboğazların iddiasının əksinə olaraq, İbn Abidin öz haşiyəsində «üzv» sözünə belə bir izah vermir, əksinə, Əbus-Suudun bu izahı rədd edən sözünü gətirərək heç bir e'tiraz bildirmir. Hətta İbn Abidin «Minhətul-Xaliq» adlı haşiyəsində Əbus-Suud kimi bu izahın dilə gətirilməyəcək bir izah olduğunu açıq şəkildə qeyd edir: «Üzvün daha kiçik olması məsələsinə gəlincə, «üzv» deyilərkən nəyin qəsd edildiyi araşdırılmalıdır. Bu sözə ağıza alınmayacaq bir izah verilmişdir». [İbn Abidin, «Minhətul-Xaliq aləl-bəhrir-raiq», I, 610]

[3] Çox güman bununla qəsd edilən mikrosefaliya xəstəliyidir.

Mə’lum məsələdir ki, həm Əbus-Suud həm də İbn Abidin «ağıza alınmayacaq» deyərkən həmin izahın nə qədər boş bir izah olduğunu qəsd edirlər. Çünki fiqhi kitablarda təharət babında cinsi orqandan onsuz da danışılır, əgər həmin izahın onlara görə bir dəyəri olsaydı ona ağıza alınmayacaq deməz, təharət bölümündə cinsi orqanlarla əlaqəli əhkamlardan bəhs etdikləri kimi bunu da qeyd etməyi müşkül görməzdilər.

Boşboğazların iddia etdiyi kimi, əgər «üzv» sözünə verilən bu izah məzhəbdə fiqhi bir görüş olsaydı, bunu Əbu Hənifədən və tələbələrindən, onlardan elm alan məşayixdən yaxud məzhəbin mö’təbər kitablarından oxumalı idik. Çünki imamət məsələsi yeni çıxan bir məsələ deyil. Əgər bu görüş məzhəbə aid fiqhi bir görüş olsaydı, nə Əbus-Suud, nə də İbn Abidin bu izaha «ağıza alınmayacaq söz» deməzdi.

Əbus-Suudun və İbn Abidinin də qeyd etdiyi kimi, «üzv» sözünü cinsi orqan kimi açıqlamaq ağıza alınmayacaq boş bir izahdır və heç bir əsası yoxdur. Bu izahı verənlər öz dövrlərində məşhur olan bir düşüncəyə əsaslanmışlar. Onlara görə cinsiyyət orqanının həddən artıq böyük olması insanın şəxsiyyətindəki naqisliyə dəlalət edirdi. Şeyx ət-Tahtavi bu haqda belə deyir: «Üzvün kiçik olması məsələsinə gəlincə, şeyxlərdən bə’ziləri bunu cinsiyyət üzvünün qısa olması kimi açıqlayıblar. Çünki (onlara görə) cinsi orqanı həddən artıq böyük olmaq çox zaman kişinin mayasındakı düşüklüyə dəlalət edir. Bu məsələ («üzv» sözünün bu mə’nada olması) bir də araşdırılmalıdır». [ət-Tahtavi, «Haşiyətut-tahtavi alə məraqil-fəlah», 301]

Onu da qeyd edim ki, hətta «üzv» sözünə bu mə’nanı verənlər belə cahil boşboğazların iddia etdiyi kimi cinsiyyət üzvünə baxılmasını, yaxud onun ölçülməsini qəsd etməmişlər. İmamlığa daha layiq olmaq üçün sadalanan şərtlər arasında şəxsin elmli və təqvalı olması ön sıralarda qeyd edildiyi halda cinsiyyət üzvünə baxmağı necə qəsd edə bilərlər? Axı başqasının övrətinə baxmaq təqvaya zidd, haram bir əmədir. Bu izahı verənlər bunu bir «iftiraziyyat» (fərziyyə) olaraq qeyd ediblər, yə’ni qəsdsiz şəkildə hər hansı bir yolla bu bilinərsə onlara görə əsas alına bilər, lakin bilinməzsə araşdırılmaz. Bu səbəbdən ət-Tahtavi öz haşiyəsində belə deyir: «(Üzv sözü bə’zilərinin dediyi mə’nada olarsa) bu adətən ittila’ (qəsdsiz şəkildə olsa da görmək ya da xəbərdar olmaq), və yaxud xəbər vasitəsilə bilinən bir şeydir. (Bu səbəbdən) bunu bilmək nadir bir haldır. Eyni şeyi az əvvəl keçən «xanımı daha yaxşı olan» sözü haqda da demək olar.» [ət-Tahtavi, «Haşiyətut-tahtavi alə məraqil-fəlah», 301]

Yə’ni bu şey qəsdli şəkildə övrətə baxmaqla deyil, müalicə kimi hər hansı bir fövqəladə hal səbəbiylə görmək, yaxud bu səbəblə görən birinin xəbər verməsiylə bilinə bilər ki, bu da çox nadir bir şeydir. Hətta ət-Tahtavi, kimin xanımının daha xoş rəftar olması məsələsinin də nadir halda bilinən bir şey olduğunu deyir.

Bu məsələ sünnət olunmamış birinin imam durmasının məkruh olmasına bənzəyir. Digər məzhəblərdə olduğu kimi, rafizilərin fiqh kitablarında da sünnət olunmamış birinin namazda imam durmasının məkruh olduğu keçir. [Bax: İbn İdris əl-Hilli, «əs-Sərairul-havi li təhriril-fətəvi», I, 280; ] Məgər

onlar imam duran hər kəsin sünnət olunub olunmadığını bilmək üçün bunu ondan soruşurlar? Yoxsa övrətinə baxmağı tələb edirlər? Təbii ki, nə soruşurlar nə də övrətini göstərməyi tələb edirlər, sadəcə qəsdsiz şəkildə biri onun sünnət olunmadığını görər yaxud bundan xəbər tutar və insanlara bildirərsə, onun yerinə başqa birini imam keçirərlər.

Yenə də Əbus-Suud və İbn Abidinin də qeyd etdiyi kimi «üzv» sözünə bu cür ağıza alınmayacaq bir izah vermək batildir. Ümumiyyətlə «üzv» sözünə bu cür izah verənlərin kimliyi mə'lum deyil, bunun əksinə olaraq bu izahı rədd edənlər isə məzhəbin məşhur aimlərindəndir.

Fəqihlər «üzv» sözü ilə nə qəsd edildiyini araşdırmağa sövq edir. Şəxsən mənə görə, üzvün kiçikliyinin başın böyüklüyüylə birgə qeyd edilməsi mə'nanı başa düşməyə kömək edir. Bu onu göstərir ki, burada qəsd edilən üzv başa aid bir üzvdür. Zənnimcə burada qəsd edilən burunla qulaqdır, çünki qədimdə yayğın olan yanlış bir düşüncəyə görə burunun həddən artıq böyük və qalın olması ağlın zəifliyinə dəlalət edirdi. Həddən artıq böyük qulağa sahib şəxslər haqda da bu cür yanlış bir düşüncə var idi. İbn əl-Cövzi bu haqda belə deyir: «Burnu kobud və həddən artıq iri olan şəxsin fəhmi zəif olur... qulağı həddən artıq iri olan şəxs də cahil olur». [İbn əl-Cövzi, «Əxbərul-həmqa vəl-muğaffəlin», 31]

### BU ŞEYLƏR HƏNƏFİ MƏZHƏBİNƏ AİD BİR GÖRÜŞ HESAB EDİLƏ BİLƏRMİ?



Bir çox insan fiqhi kitablarda keçən hər şeyin fiqhi məsələ olduğunu, yaxud hansı məzhəbin kitabında keçirsə həmin məzhəbin görüşü sayıldığını zənn edir. Bu cür bir yanlışa düşməmək üçün iki şeyin fərqini bilmək lazımdır:

1) Dini-fiqhi hökm.

2) O hökmü daha yaxşı icra etmək üçün məzhəbi təqlid edən alimlərin düşünüb təklif etdikləri yollar.

Misal üçün ayaqyoluna girən birinin işini görüb qurtardıqdan sonra özünü yuyub-təmizləməsi vacibdir. Bunun, yə'ni təmizliyin vacib olması dini-fiqhi bir hökmdür. Lakin həmin şəxsin özünü təmizləyərkən əllərini və barmaqlarını nə cür istifadə etməsi fiqh kitablarında keçsə də dini-fiqhi bir hökm deyil, həmin şəxslərin fiqhi hökm olan istincanı (ayaqyolundan sonra təmizlənməyi) ən yaxşı şəkildə həyata keçirmək üçün təklif etdikləri şeylərdir. Bu iki şey arasında fərqi bilməmək insanın oxuduğu hər şeyi dini-fiqhi bir məsələ kimi qəbul etməsinə yol açar.

Namazda imamət məsələsində də dini-fiqhi olan hökm birdir. İmam Əbu Bəkr əl-Kəsaninin qeyd etdiyi kimi: «İmamlığa kimin daha layiq olması məsələsindəki ölçü fəzilət və üstünlükdür». [əl-Kəsani, «Bədəi'us-sanəi' fi tərtibiş-şərai'», I, 491]

Lakin bundan sonra «üstünlük və fəzilət» ölçüləri haqda fəqihlərin öz zəmanələrində məşhur olan mə'lumatlara əsasən müxtəlif fikirlər irəli sürməsi dini və fiqhi məsələlər deyil. Bu səbəbdən birinci hökm, yə'ni

üstün və fəzilətli şəxsin imamlığa daha layiq olması hökmü inkar edilə bilməz, lakin üstünlüyün ölçüsü haqda irəli sürülən şeylər müzakirəyə açıqdır və inkar da edilə bilər.

Bu şeylərin məzhəbin mö'təbər qaynaqlarında qeyd edilməməsi də bundan qaynaqlanır. Namazda imamlıq kimi bir məsələylə əlaqəli dini-fiqhi bir hökm məzhəbin mö'təbər kitablarından yan keçə bilməzdi, lakin həmin hökmü daha yaxşı icra etmək üçün irəli sürülən təkliflərin dini-fiqhi hökmlər sayılmadığı üçün bu kitablarda qeyd edilməməsi adi haldır.

Məzhəbdə bu şeylərin qeyd edilmədiyi mö'təbər qaynaqlardan bə'ziləri aşağıdakılardır:

1) Məzhəbin qurucularının görüşlərinin yer aldığı «Zahirur-Rivayə» kitabları.

2) İmam əl-Hakim əş-Şəhidin «əl-Kafi» kitabı və əs-Sərxasinin ona şərh olaraq qələmə aldığı «əl-Məbsut» əsəri.

3) İmam ət-Tahavinin «əl-Muxtasar» əsəri və İmam Əbu Bəkr əl-Cəssasın onu şərh etdiyi «Şərh muxtasarit-tahavi» əsəri.

4) İmam əl-Qudurinin «əl-Kitab»ı və əl-Meydaninin onu şərh etdiyi «əl-Lubəb» adlı əsəri.

5) İmam Aləuddin əs-Səmərqəndinin «Tuhfətul-fuqaha»sı və İmam Əbu Bəkr əl-Kəsəninin onu şərh etdiyi «Bədəi'us-sanəi' fi tərtibiş-şərai'» əsəri.

6) İmam əl-Mövsilinin «əl-Muxtar» mətni və özünün ona şərh olaraq yazdığı «əl-İxtiyar li tə'lilil-muxtar» əsəri.

7) İmam əl-Mərğinaninin «Bidəyətul-mubtədi»si və özünün ona şərh olaraq yazdığı «əl-Hidəyə şərh bidəyətil-mubtədi» əsəri.

8) İmam Burhənəddin əl-Buxarinin «əl-Muhitul-burhəni» əsəri.

9) İbn əs-Saətinin «Məcmə'ul-bəhreyn» kitabı.

10) İmam ən-Nəsəfinin «Kənzud-dəqaiq» mətni.

Eləcə də bir çox mətn, şərh və fətvalar kitabında bu şeylərin heç biri qeyd edilmir. Əgər bu şeylər fiqhi-dini bir görüş olsaydı bu kitablardan yan keçməzdi.

## Son

Məqaləni buraya qədər oxuduzsa, məsələnin boşboğazların iddia etdiyi kimi olmadığını, ümumiyyətlə bu şeylərin fiqhi hökm sayılmadığını və bu səbəbdən hər hansı bir fiqhi məzhəbin görüşü sayılmayacağını bildiz. Son olaraq isə məsələ haqda şəxsi fikrimi qeyd etmək istəyirəm.

Hansı mə'nanı qəsd etmələrindən asılı olmayaraq, fəqihlərin bu şəkildə ölçülər qeyd etməsi iki səbəbdən doğru deyil:

**Birincisi** Evli cütlüklərdən hər hansı birinin xoşrəftar olması digər tərəfin hər zaman qədirbilən biri olacağı demək deyil. Şeytan insanın nəfsiylə

daim sövdələşmiş haldadır, bu səbəbdən ehtimala əsaslanan ölçülər qoymaq doğru deyil.

Həmçinin ağıl və fəhmin insanın zahiri görkəmiylə bir əlaqəsi yoxdur. Zahiri görkəmi düzgün olan nə çox insan var ki, bir az söhbət etdikdən sonra nə qədər axmaq olduğu ortaya çıxır. Bunun əksinə zahirən bir çoxunun qüsurlu hesab etdiyi nə qədər alimlər olub. Elm, ağıl, dərrakə kimi xüsusiyyətlər onsuz da hər kəs tərəfindən sonradan əldə edilir. Bu isə əvvəlcə Allahın lütfünə, sonra isə insanın yetişdiyi mühitə, yaxud mühitindən asılı olmayaraq özünü yetişdirməsinə bağlıdır.

**İkinci** səbəb isə budur ki, bu şeyləri şəxsin elmli və təqvalı olması şərtindən sonra qeyd etmişlər; əvvəlcə şəxslərin elminə və təqvasına baxılır, əgər bu iki xüsusiyyət bir neçə şəxsdə bərabər olarsa daha sonra digər xüsusiyyətlərə baxıla bilər. Ölçü kimi qeyd edilən bu şeylər də təqva və elm xüsusiyytləri yerində olan bir neçə insanda ən son nəzərə alınacaq xüsusiyyətlər arasındadır. Şəxslərin təqvalı və elmli olması isə həyat yoldaşıyla münasibətdə, eləcə də şəxsiyyətlərində naqisliyin olmadığına onsuz da dəlalət edir. Belə olduğu halda vücudlarının quruluşunun nəyəsə dəlalət edib etməməsini araşdırmaq boş bir addımdır.

Bu səbəbdən qeyd etdiyim kimi, nə məzhəbin qurucu imamlarının sözlərində, nə də məzhəbin mö'təbər qaynaqlarında bu şeylərə rast gəlmək olar.

Hər bir elm kimi fiqh elmi də təcdidə möhtacdır. Məzhəbi yaxşı bilən elm əhlinin məzhəbin üsulu işığında bu elmi yeni tərtib və misallarla qələmə alması, sadəcə əvvəlki qaynaqlardan nəql verməklə kifayətlənməməsi, lazımsız təfərrüatdan uzaq durması, müasir dövrdə fiqhi qabiliyyətin inkişafına səbəb olacaq töhfələr verməsi lazımdır.



Bitirməyi nəsib edən Allaha həmd olsun.

İSTİFADƏ EDİLMİŞ QAYNAQLAR

**Əbus-Suud,** «Fəthul-muin alə molla miskin» köhnə nəşr, haqqında mə'lumat görmədim.

**əl-Haskəfi,** «əd-Durrul-muxtar şərh tənviril-əbsar və cami'ul-bihar», Beyrut, «Darul-kutubil-ilmiyyə» nəşriyyat evi, birinci nəşr: 1423 h./2002 m. Təhqiqatçı: Əbdülmun'im Xəlil İbrahim.

**əl-Hilli,** «əs-Sərairul-havi li təhriril-fətəvi», Qum, «Muəssəsətun-nəşril-isləmi» mətbəəsi, ikinci nəşr: 1410 h./1990 m. Təhqiqatçı: Təhqiqat hey'-əti.

**əl-Kəsəni,** «Bədəi'us-sanəi' fi tərtibiş-şərai'», Qahirə «Darul-Hədis» nəşriyyat evi, birinci nəşr: 1426 h./2005 m. Təhqiqatçı: Məhəmməd Məhəmməd Təmir.

**əş-Şurunbulali,** «Mərqail-fəlah bi imdədil-Fəttah şərh nuril-idah və nəcətil-ərvah», Qahirə «Darul-bəsair» nəşriyyat evi, birinci nəşr: 1437 h./2016 m. Təhqiqatçı: Əhməd Mahmud əl-Utmuni.

**İbn Abidin,** «Minhətul-Xaliq aləl-bəhrir-raiq», Beyrut, «Darul-kutubil-ilmiyyə» nəşriyyat evi, birinci nəşr: 1418 h./1997 m. «əl-Bəhrur-raiq» kitabıyla bərabər çap edilmiş nəşr.

**İbn Abidin,** «Raddul-muhtar aləd-durril-muxtar», Dəməşq, «Darus-səqafəti vət-turas» nəşriyyat evi, birinci nəşr: 1421 h./2000 m. Təhqiqatçı: Hüsaməddin Farfur.

**İbn əl-Cövzi**, «Əxbərul-həmqa vəl-muğaffəlin», Beyrut, «Darul-fikril-lubnəni» nəşriyyat evi, birinci nəşr: 1410 h./1990 m.